Doxsan yeddinci hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c۳۸, s۶۵, hədis . [۱] -۱
۲۲۹۶۷; "Fəzaili Əhməd", s۲۲۳, hədis ۳۰۲; "Müsnədi Royani", s۱۳۲, hədis ۳۰۹; "Müşkilul-
.asar Təhavi", c۴, s۱۱۰, (bab ۴۷۶), hədis ۳۳۱۵

Doxsan səkkizinci hədis başqa mənbələrdə: "Tərcümətil-İmam Əli min Tarix . [۲] -۲
.Dəmeşq", c۲, s۲۸, hədis ۵۲۹

ki, Muhəmmədin (s) əshabına and verərək buyurdu: Sizin hansınız Rəsulullahın (s) Qədir-xum günündə buyurduğunu eşitmişdir? Bir dəstə ayağa qalxıb şəhadət verdilər ki Peyğəmbər (s) belə buyurdu: "Mən hər kimin mövlasıyamsa Əli də onun mövlasıdır. İlahi! Onu sevəni sev və onu düşmən tutanı düşmən tut. Onu sevəni sev və ona kin bəsləyəni düşmən tut. Və ona kömək edənə kömək et"(١).

## Əlini sevmək mömini və münafiqi bir-birindən ayırır

١٠٠. أخبرنا [أبو كريب] محمّد بن العلاء [الكوفى]، قال: حدثّنا أبو معاويه عن الأعمش، عن عدّى بن ثابت، عن زِرّ بن حُبيش، عن علىّ×, قال: «والّذى فلق الحبه وبَرَأَ النَّسَمه؛ [انه] لعهد النبىّ الأُمّىّ|: إلىّ [ان] لا يُحبّنى إلّا مؤمن ولا يُبغِضنى إلّا منافق».

١٠٠- Əli (ə) buyurdu: Toxumu yaran və varlığı icad edən yaradana and olsun! Ummi (dərs oxumamış) Peyğəmbər (s) mənim barəmdə belə buyurdu: "Yalnız mömin məni sevər və münafiqdən başqası mənə kin bəsləməz"(٢).

١٠١. أخبرنا واصل بن عبد الأعلى [الكوفى]، قال: حدثّنا وكيع عن الأعمش، عن عدّى بن ثابت، عن زِرّ بن حُبيش، عن علىّ×, قال: «عهد إلىَّ النبىّ| أن لا يُحِبّنى إلّا مؤمن ولا يُبغِضَنى إلّا منافق».

١٠١- Əli (ə) buyurdu: Peyğəmbər (s) mənim barəmdə belə buyurdu: "Yalnız mömin məni sevər və münafiqdən



---

١- [١]. Doxsan doqquzuncu hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c٢, s٢۶٢, hədis ٩٥١; "Fəzaili Əhməd", s٩٧, hədis ١۴۴; "Müsnədi Bəzzar", c٣, s٣۴-٣٥, hədis ٧٨۶; "Mənaqibi Kufi", c٢, s٣۶٧, hədis ٨۴٣, və s٣٨٣, hədis ٨٥٧, və s۴٢٩, hədis ٩١١, və s۴۴۴, hədis ۴٣٢, və s۴٥١-۴٥٢, hədis ٩۴٢-٩۴٣; "Möcəmi kəbir Təbərani", c٥, s١٩٢, hədis ٥٠٥٩; "Əmaliyi Tusi", s٢٢٧, hədis ٣٩٨; "Fəraidus-Semtin", s۶٨, hədis ۴۴; "Əl-bidayə vən-nihayə", c٧, s٣۶٠; "Kənzül-ümmal", c١٣, s١٥٨, hədis ٣۶۴٨٧.

٢- [٢]. Yüzüncü hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c۶, s٣۶٨, hədis ٣٢٠٥٥; "Səhihi Müslim", c١, s٨۶, (bab ٣٣), hədis ١٣١; "Sünəni İbn Macə", c١, s١١۴; "Kitabus-sünnə", s٥٨۴, hədis ١٣٢٥; "Sünəni kübra", Nisai, c٥, s۴٧, hədis ٨١٥٣; "Səhihi İbn Həbban", c١٥, s٣٧۶, hədis ۶٩٢۴; "Mənaqibi Kufi", c٢, s۴٧٩, hədis ٩٧٨; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c٢, s١٩٥, hədis ۶٨٩-۶٩٠.

.(başqası mənə kin bəsləməz"(١

١٠٢. أخبرنا يوسف بن عيسى، قال: أخبرنا الفضل بن موسى، قال: أخبرنا الأعمش عن عدّى بن ثابت، عن زِرّ, قال: قال علىّ×: «انه لعَهْد النبىّ| إلىّ أنه لا يُحِبُّك إلّا مؤمن ولا يُبغِضُك إلّا منافق».

Ummi (dərs oxumamış) Peyğəmbər (s) mənim barəmdə belə buyurdu: "Yalnız - ١٠٢ .(mömin məni sevər və münafiqdən başqası mənə kin bəsləməz"(٢

## Əlinin İsaya bənzərliyi

١٠٣. أخبرنا [أبو جعفر] محمّد بن عبد الله بن المبارك [المخرمىّ]، قال: حدثّنا يحيى بن معين، قال: حدثّنا [عمر بن عبد الرحمان] أبو حفص الأبّار عن الحكم بن عبد الملك، عن الحارث بن الحصيره, عن أبى صادق، عن ربيعه بن ناجد، عن علىّ× قال: قال رسول الله|: يا علىّ×, فيك مثل من عيسى, أَبْغَضَتْه يهود حتّى بَهَتوا أُمَّه، وأَحَبَّتْه النصارى حتّى أنزَلوه بالمنزل الّذى ليس به».

Əli (ə) buyurdu: Rəsulullah (s) buyurdu: " Ya Əli! Sənin İsa ilə oxşarlığın vardır. - ١٠٣ Yəhudilər ona (o qədər) kin bəslədilər ki, anasına böhtan atdılar. Xristianlar isə onu (o qədər) sevdilər ki, onu layiq olmadığı məqamda təsəvvür etdilər. (Yəni onu Allah .(güman etdilər)(٣



---

١- [١] . Yüz birinci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c٦, s٣٦٨, hədis ٣٢٠٥٥; Müsnədi Əhməd", c٢, s١٣٦, hədis ٧٣١, və s٣١٦, hədis ١٠٦٢; "Fəzaili Əhməd", s٤٥, hədis ٧١; "Səhihi Müslim", c١, s٨٦, hədis ١٣١; "Sünəni İbn Macə", c١, s٤٢, hədis ١٤٤; "Kitabus-sünnə", s٥٨٤, hədis ١٣٢٥; "Mənaqibi Kufi", c٢, s٤٦٩, hədis ٩٦٣; "Sünəni kübra", Nisai, c٦, s٥٣٥, hədis ١١٧٥٣; "Kənzi-fəvaid", c٢, s٨٣; "Mənaqibi İbn Məğazili", s١٩٣, hədis ٢٢٨, və s١٩٥, hədis ٢٣١.

٢- [٢] . Yüz ikinci hədis başqa mənbələrdə: "Müsnədi Həmidi", c١, s٣١, hədis ٥٨; Müsnədi Əhməd", c٢, s٦٤٢, hədis ٧١; "Fəzaili Əhməd", s٥٦, hədis ٨٤; "Sünəni İbn Macə", c١, s٤٢, hədis ١١٤; "Sünəni Termizi", c٥, s٦٤٣, hədis ٣٧٣٦; "Sünəni kübra", Nisai, c٦, s٥٣٤, hədis ١١٧٤٩; "Mənaqibi Kufi", c٢, s٤٨٢, hədis ٩٨٢; "Müsnədi Əbu Yə`la", c١, s٢٥١, hədis ٢٩١, və s٣٤٧, hədis ٤٤٥; "Əmaliyi Tusi", s٢٥٨, hədis ٤٦٥; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c٢, s١٩٠-١٩١, hədis ٦٨٢-٦٨٤, və s١٩٥-١٩٩, hədis ٦٩١-٧٠٠; "Mənaqibi İbn

Məğazili", s۱۹۰-۱۹۱, hədis ۲۲۵-۲۲۶, və s۱۹۳-۱۹۴, hədis ۲۲۹-۲۳۰; "Mənaqibi Xarəzmi", s۳۲۶, hədis ۳۳۶.

[۳] -۳ . Yüz üçüncü hədis başqa mənbələrdə: "Müsənnif Əbdür-rəzzaq", c۱۱, s۳۱۸; Müsnədi Əhməd", c۲, s۴۶۸-۴۶۹, hədis ۱۳۷۶-۱۳۷۷; "Fəzaili Əhməd", s۹۹, hədis ۱۴۷, və s۱۴۴, hədis ۲۰۹, və s۷۱۳, hədis ۳۴۳-۳۴۴; "Zöhd Əhməd", s۳۰۹, hədis ۱۱۹۱-۱۱۹۲; "Tarixi kəbiri Buxari", c۳, s۲۸۱, hədis ۹۶۶; "Təfsiri Fərat Kufi", s۲۰۴-۲۰۶, hədis ۵۴۰-۵۴۲; "Kitabus-sünnə", s۴۷۰, hədis ۱۰۰۴; "Müsnədi Əbu Yə`la", c۱, s۴۰۶, hədis ۵۳۴; "Möcəmi kəbir Təbərani", c۱, s۳۲۰, hədis ۹۵۱; "Əmaliyi Tusi", s۳۴۴, hədis ۷۰۹; "Ənsabul-Əşraf", s۳۳, hədis ۸۲; "Mənaqibi İbn Məğazili", s۷۱, hədis ۱۰۴.

۱۰۴. أخبرنا اسماعیل بن مسعود [البصری]، قال: حدثّنا خالد [ بن الحارث] عن شعبه، عن أبی إسحاق، عن العلاء [بن عرار], قال: سأل رجل ابن عمر عن عثمان قال: کان من الّذین تولّوا یوم التقی الجمعان, فتاب الله علیه, ثمّ أصاب ذنباً فَقَتَلوه, وسأله عن علیّ× فقال: لا تسأل عنه, ألا تری قرب منزله من رسول الله|.

Bir kişi Ömərin oğlu (Əbdullahdan) Osman barəsində soruşdu? Belə cavab verdi: O -۱۰۴ Ühüd döyüşündə mərəkədən qaçanlardan idi ki, Allah günahını bağışladı. Sonra bir günah etdiyi üçün camaat onu öldürdülər. O kişi Əli (ə) barəsində soruşduqda isə Ömərin oğlu belə dedi: Onun barəsində soruşma. Görmürsən ki, onun evi Rəsulullahın !?((s) evinin yaxınlığındadır(۱

۱۰۵. أخبرنی هلال بن العلاء بن هلال, قال: حدثّنا حسین [بن عیّاش], قال: حدثّنا زهیر [بن معاویه] عن أبی إسحاق، عن العلاء بن عرار, قال: سألتُ عبد الله بن عمر, قلت: ألا تُحَدِّثنی عن علیّ× وعثمان؟ قال: أمّا علیّ×: فهذا بیته من رسول الله| ولا أُحَدِّثُک عنه بغیره، وأمّا عثمان: فانه أَذنَب یوم أُحُد ذنباً عظیماً فعفا الله عنه، وأَذنَب فیکم [ذنباً] صغیراً فقتلتموه.

Əla ibn Ərar deyir: Ömərin oğlu Əbdullaha dedi: Əli ilə Osman barəsində mənimlə -۱۰۵ danışmırsan? Əli barəsində bu kifayətdir ki, Rəsulullahın (s) evinin yaxınlığındakı ev onun evidir. Onun barəsində başqa bir söz deməyəcəm. Amma Osman Ühüd müharibəsində (döyüşdən qaçdığı üçün) böyük bir günah etdi və Allah onu bağışladı. .(Amma sizin yanınızda kiçik bir günah etdiyi üçün onu öldürdünüz(۲

۱۰۶. أخبرنا احمد بن سلیمان (الرهاوی)، قال: حدثّنا عبید الله (بن موسی)، قال: حدثّنا إسرائیل



---

Yüz dördüncü hədis başqa mənbələrdə: "Müsənnif Əbdür-rəzzaq", c۱۱, s۲۳۲, . [۱] -۱ hədis ۲۰۴۰۸; "Fəzaili Əhməd", s۹۰, hədis ۱۳۴; "Mənaqibi Kufi", c۲, s۲۲, hədis ۵۱۱; "Möcəmi əvsəti Təbərani", c۲, s۹۷, hədis ۱۱۸۸;"Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c۱, s۲۸۷, hədis ۳۲۸; "Təhzibul-kəmal", c۲۲, s۵۲۸-۵۲۹, hədis ۴۵۸۰; "Mizanul-.e`tidal", c۳, s۶۴-۶۵, hədis ۵۶۱۰; "Əl-qəvlul-müsəddəd",s۳۰

Yüz beşinci hədis başqa mənbələrdə: Həmən Yüz dördüncü hədisin . [۲] -۲ .mənbə`ləridir

عن أبی اسحاق, عن العلاء بن العرار قال: سألت ابن عمر وهو فی مسجد رسول الله | عن علیّ × وعثمان؟ فقال أمّا علیّ ×: فلا تسألنی عنه وانظر إلی منزله من رسول الله | لیس فی المسجد بیت غیر بیته، وأما عثمان: فانه اذنب ذنباً عظیماً [تولّی] یوم التقی الجمعان فعفا الله عنه وغفر له فأَذنبَ فیکم دون ذلک فقتلتموه.

١٠۶ - Bu hədis qabaqkı hədis kimidir. Əla ibn Ərar deyir: Məscidün-nəbidə Ömərin oğlundan Əli ilə Osman barəsində soruşdum? Belə dedi: Əli barəsində soruşma. Onun Rəsulullahın (s) evinin kənarındakı mənzilinə baxmağın (kifayətdir). Məsciddə onun evindən başqa ev yoxdur. Amma Osman Ühüd müharibəsində döyüşdən qaçdığı üçün böyük bir günah etdi və Allah onu bağışladı. Amma sizin yanınızda daha kiçik bir günah etdiyi üçün onu öldürdünüz(١).

١٠٧. أخبرنا اسماعیل بن یعقوب بن اسماعیل قال: حدثّنا ابن موسی ــ وهو محمّد بن موسی بن أعین ــ قال: حدثّنا أبی عن عطاء [بن السائب] عن سعد بن عبیده, قال: جاء رجل إلی ابن عمر, فسأله عن علی؟ فقال: لا تسأل عن علیّ، ولکن أنظر إلی بیته من بیوت النبی | قال: فانی أُبغِضُه قال: أَبغَضَک الله.

١٠٧- Səd ibn Übeydə deyir: Bir kişi Ömərin oğlunun yanına gəldi və ondan Əli barəsində soruşdu? Belə cavab verdi: Əli barəsində suala ehtiyac yoxdur. Onun Rəsulullahın (s) evinin kənarındakı mənzilinə baxmağın (kifayətdir). O kişi dedi: Mən Əliyə qarşı kinliyəm. Ömərin oğlu ona dedi: Allah səni düşmən tutsun(٢).

١٠٨. اخبرنی هلال بن العلاء بن هلال، قال: حدثّنا حسین ــ هو ابن عیّاش ــ، قال: حدثّنا زهیر [بن معاویه]، قال: حدثّنا أبو اسحاق، قال: سأل عبد الرحمان [بن خالد] قثم بن العبّاس: من أین وَرَث علیّ × رسولَ الله |؟ قال: أنه کان أوّلنا به لحوقاً، وأشدّنا به لزوقاً.

١٠٨ - Xalidin oğlu Əbdürrəhmandan Əlinin niyə Peyğəmbərin (s) varisi olduğunu soruşdular? Belə cavab verdi: Çünki o, Peyğəmbərə (s) bizim hamımızdan tez



---

١- [١] Yüz altıncı hədis başqa mənbələrdə: Həmən Yüz dördüncü hədisin mənbə`ləridir.

٢- [٢] Yüz yeddinci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c۴, s٣۶٨, hədis ٣٢٠۵٩; "Səhihi Buxari", c۶, s٣٢; "Tarixi kəbiri Buxari", c۵, s٢٣; "Ənsabul-əşraf", s٨٩, hədis ٢١۴; "Möcəmi kəbiri Təbərani", c١٢, s٣١٧, hədis ١٣۵٣٣; "Şəvahidüt-tənzil", c١, s٣٠;

.(qoşulmuş (iman gətirmiş) və yaxın olmuşdur(١)

١٠٩. أخبرنا هلال بن العلاء، قال: حدثّنا أبی، قال: حدثّنا عبیدالله [بن عمرو الرقّی]، عن زید بن أبی أنیسه، عن أبی اسحاق، عن خالد بن قثم أنه قیل له: ما لعلی× وَرِثَ رسولَ الله | دون جدِّک وهو عمّه؟ قال: أن علیّ×اً کان اوّلنا به لحوقاً, واشدّنا به لصوقاً.

Peyğəmbərin (s) əmisi Abbasın nəvəsi Xalid ibn Qəsəmdən, niyə sənin baban - ١٠٩ Peyğəmbərin (s) əmisi olmasına baxmayaraq deyil, Əli o Həzrətin (s) varisidir soruşduqda-belə cavab verdi: Çünki o, Peyğəmbərə (s) bizim hamımızdan tez .(qoşulmuş(iman gətirmiş) və O Həzrətlə (s) birlikdə addımlamışdır(٢)

١١٠. أخبرنا عبده بن عبد الرحیم [المروزی]، قال: أخبرنا عمرو بن محمّـد، قال: أخبرنا یونس بن أبی اسحاق عن العیزار بن حُرَیث، عن النعمان بن بشیر, قال: استأذن أبو بکر علی النبیّ | فسمع صوت عائشه عالیاً، وهی تقول: لقد علمتُ أن علیّ×اً أَحَبُّ الیک من أبی. فأهوی الیها أبوبکر لِیَلطِمَها وقال: یا ابنت فلانه! أراکِ تَرفعینَ صوتَکِ علی رسول الله |؟! فأمسکه رسول الله |، وخرج أبوبکر مُغضباً، فقال رسول الله |: «یا عائشه؛ کیف رأیتنی أنقذتک من الرجل»؟ ثمّ استأذن أبوبکر بعد ذلک وقد اصطلح رسول الله | وعائشه، فقال: أدخلانی فی السلم کما ادخلتمانی فی الحرب؟ فقال رسول الله صلّی الله علیه وآله: «قد فعلنا».

Əbu Bəkr Peyğəmbərdən (s) hüzuruna çatmaq üçün icazə istədi. Bu zaman qızı - ١١٠ Ayişənin səsini eşitdi ki, uca səslə "Allaha and olsun bilirəm Əli sənin üçün atamdan daha sevimlidir"- deyirdi. Əbu Bəkr ona zərbə vurmaq üçün hücum edərək dedi: Ay filankəsin qızı, Görürəm Rəsulullahın (s) başına qışqırırsan?! Peyğəmbər(s) Əbu Bəkrə mane oldu. O da hirslə çölə çıxdı. Bu zaman Rəsulullah (s) Ayişəyə buyurdu: "Ay Ayişə! Gördün necə səni bu kişinin əlindən xilas etdim?" Rəsulullah (s) ilə Ayişənin arasındaki ixtilaf bitdikdən sonra Əbu Bəkr yenə hüzura çatmaq üçün icazə istəyərək dedi: Mənə dava edərkən daxil olmaq üçün icazə verdiyiniz kimi sülh varkəndə icazə verirsinizmi? :Peyğəmbər (s) buyurdu



---

Yüz səkkizinci hədis başqa mənbələrdə: "Əl-iləlü vəl-mə`rifə", c١, s١۴٧; "Möcəmi . [١] -١ kəbiri Təbərani", c١٩, s۴٠; "Müstədrəki Hakim", c٣, s١٢۵; "Tarixi Dəmeşq", c٣, s١۴, hədis .١٠٣۴-١٠٣۵; "Təraifi İbn Tavus", c١, s٢٨۴

Yüz doqquzuncu hədis başqa mənbələrdə: Həmin Yüz səkkizinci hədisin . [٢] -٢ mənbələridir. Və habelə Əlinin (ə) varisliyi barəsində olan altımış dörd və altımış beşinci .hədisdə də gəlmişdir

.(Bəli) biz belə edirik*"(۱)"

۱۱۱. أخبرنی محمّد بن آدم [بن سلیمان المصیصی]، قال: حدثّنا [یحیی بن عبد الملک بن حمید] بن أبی غنیّه عن أبیه، عن أبی اسحاق الشیبانی, عن جُمَیع ـ وهو ابن عمیر ـ قال: دخلتُ مع امّی علی عائشه وانا غلام، فذکرت لها علیّ×اً, فقالت: ما رأیتُ رجلاً أَحبَّ إلی رسول الله | منه، ولا امرأةً أحبّ إلی رسول الله | من امرأته.

Cüməy ibn Üməyr deyir: Yeniyetmə olduğumda anamla birlikdə Ayişənin yanına -۱۱۱ getdik. Anam onun yanında Əlidən söz açdı. Ayişə dedi: Rəsulullahın (s) yanında ondan .(və onun həyat yoldaşı ]Fatimədən (s)[ daha sevimli heç bir kişi və qadın görmədim(۲)

۱۱۲. أخبرنا عمرو بن علیّ× [البصری]، قال: حدثّنا عبد العزیز بن الخطّاب ـ ثقه ـ قال: حدثّنا محمّد بن اسماعیل بن رجاء الزبیدی، عن أبی اسحاق الشیبانی، عن جُمَیع بن عمیر قال: دخلتُ مع امّی علی عائش, فسمعتُها تسألها من وراء الحجاب عن علیّ×؟ فقالت: تَسألینی عن رجل ما أَعلمُ احداً کان أحبَّ إلی رسول الله | منه، ولا أَحبَّ إلیه من امرأته.

Bu hədis qabaqkı hədis kimidir. Nisai onu az bir -۱۱۲



---

Yüz onuncu hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c۳۰, s۳۴۱, hədis ۱۸۳۹۴, . [۱] -۱ və s۳۷۲, hədis ۱۸۴۲۱; "Fəzaili səhabə Əhməd", s۲۶, hədis ۳۸; "Sünəni Əbu Davud", c۴, s۳۰۰, hədis ۴۹۹۹; "Sünəni kübra", Nisai, c۵, s۳۶۵, hədis ۹۱۵۵; "Müsnədi Bəzzar", c۸, s۲۲۳; "Kəşfül-əstar", c۳, s۱۹۴; "Məcməüz-zvaid", c۹, s۱۲۷. * . Bu hədis İmam Əlinin (ə) Rəsulullahın (s) yanında camaatın ən sevimli olduğunu çatdırır. Bunun çoxlu dəlil və şahidləri vardır. Qabaqkı hədislərdə onların bəzisini mülahizə etdiniz. Bəzisi də sonrakı hədislər də gələcək. Buna görə "Səhihi-Buxari" və "Müslimdə" Əmr ibn Asın dilindən nəql olunan "Rəsulullahın (s) yanında qadınlar və kişilərin ən sevimlisi Ayişə və atasıdır" hədisi qəbul edilməmişdir. Bu hədisin rəvayətçisi Əmr ibn As İslamdan qabaq Rəsulullahın (s) inadkar düşmənlərindən və müşriklərin başçılarından idi. O İslamdan sonra da fitnəkar və nifaqçıların başçısı və habelə İmam Əlinin (ə) düşməni idi. Və o, Quranın, Rəsulullahın (s) və O Həzrətin (s) övladlarının şahidliyinə əsasən nəsli kəsilmişin oğlu nəsli kəsilmişdir. O hədisi də Əliyə (ə) olan kini üzündən .saxtalaşdırmışdır

Yüz on birinci hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c۴۳, s۱۷۰, hədis ۲۵۰۴۶; . [۲] -۲ "Sünəni Termizi", c۵, s۷۰۱, hədis ۳۸۷۴; "Müsnədi Əbu Yə`la", c۸, s۲۷۰, hədis ۴۸۵۷;

"Mənaqibi Kufi", c۲, s۱۱, hədis ۵۷۷, və s۱۳۲, hədis ۶۱۷, və s۱۹۴, hədis ۶۶۶, və s۴۷۰, hədis ۹۶۴; "Möcəmi kəbir Təbərani", c۲۲, s۴۰۳, hədis ۱۰۰۸; "Tarixi Corcan", s۲۱۳, hədis ۳۲۹; "İstiab", c۴, s۱۸۹۷; "Şəvahidüt-tənzil", c۲, s۶۲, hədis; "Əmaliyi Tusi", s۲۴۹, hədis ۴۴۰, və s۳۳۱, hədis ۶۶۳; "Mənaqibi Xarəzmi", s۷۰, hədis ۶۳; "Fəraidus-Semtin", c۱, s۳۶۷, hədis ۲۹۶.

ixtilaf və başqa bir sənədlə həmən Cüməy ibn Üməyrdən belə nəql etmişdir. Yeniyetmə olduğumda anamla birlikdə Ayişənin yanına getdik. Anamın Ayişədən Əli barəsində soruşduğunu pərdə arxasından eşitdim. Ayişə belə cavab verdi: Bir şəxs barəsində sual edirsən ki, Rəsulullahın (s) yanında ondan və onun həyat yoldaşı .(]Fatimədən (s)[ daha sevimli birini tanımıram(١

١١٣. أخبرنی زکریّا بن یحیی، قال: حدثّنا ابراهیم بن سعید قال: حدثّنا [أسود بن عامر] شاذان عن جعفر [بن زیاد] الأحمر، عن عبد الله ابن عطاء, عن ابن بریده، قال: جاء رجل إلی أبی, فسأله: ایّ النّاس کان أَحبَّ إلی رسول الله|؟ فقال: کان أَحبَّ النّاس إلی رسول الله| من النساء فاطمهُ ومن الرجال علیّ×.

İbn Boreydə deyir: Bir kişi atamdan Rəsulullahın (s) yanında camaatın ən sevimlisi -١١٣ kim olduğunu soruşduqda belə cavab verdi: Peyğəmbərin (s) yanında qadınların ən .(sevimlisi Fatimə və kişilərin ən sevimlisi isə Əli idi(٢

#### Əlinin Rəsulullahın (s) hüzuruna çatdığı zamankı məqamı

١١٤. أخبرنی محمّد بن وهب, قال: حدثّنا محمّد بن سلمه, قال: حدّثنی أبو عبد الرحیم، [خالد بن أبی یزید], قال: حدّثنی زید ـ وهو ابن أبی أنیسه ـ عن الحارث [بن یزید]، عن أبی زرعه بن عمرو بن جریر، عن عبد الله بن نُجَیّ، سمع علیّ×اً یقول: «کنت أدخل علی نبیّ الله| فان کان یصلّی سَبَّح فدخلت، وان لم یکن یصلّی أذن لی فدخلتُ».

Abdullah ibn Nucəyy deyir: Əlinin belə buyurduğunu eşitdim: "Mən Peyğəmbərin -١١٤ (s) hüzuruna çatırdım. Əgər Həzrət (s) namaz qılan halda olsaydı (mənim daxil olmağıma icazə verdiyini bildirmək üçün) təsbeh (subhanəllah) deyərdi. Mən də daxil .(olardım. Əgər namaz qılan halda olmasaydı, daxil olmağım üçün icazə verirdi"(٣



---

Yüz on ikinci hədis başqa mənbələrdə: "Şərhül-əxbar", c١, s١۴٠, hədis ٧٠-٧٢; . [١] -١ ."Müstər şidi Təbəri", s۴۴٩, hədis ١۴۶; "Müstədrəki Hakim", c٣, s١۵۴

Yüz on üçüncü hədis başqa mənbələrdə: "Sünəni Termizi", c۵, s۶٩٨, hədis ٣٨۶٨; . [٢] -٢ "Müsnədi Royani", s٢۶, hədis ۴١; "Müstədrəki Hakim", c٣, s١۵۵; "İstiab", c۴, s١٨٧٩; ."Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c٢, s١۶٢, hədis ۶۴٩

.Yüz on dördüncü hədis başqa mənbələrdə: "Tarixi kəbiri Buxari", c۶, s۵٠١ . [٣] -٣

۱۱۵. أخبرني زكريّا بن يحيى، قال: حدثّنا محمّد بن عبيد [بن حساب البصرى] وأبو كامل [فضيل بن حسين], قالا: حدثّنا عبد الواحد بن زياد, قال: حدثّنا عماره بن القعقاع عن الحارث [بن يزيد] العكلى، عن أبى زرعه بن عمرو بن جرير عن عبد الله بن نُجَىّ، قال: قال على: «كانت لى ساعةٌ من السحر ادخل فيها على أَدخلُ فيها على رسول الله | فان كان فى صلاته سَبَّح فكان ذالك اذنه لى, وان لم يكن فى صلاته اذن لى».

۱۱۵ - Bu hədis qabaqkı hədis kimidir. Nisai onu başqa bir sənədlə həmən Abdullah ibn Nucəyydən belə nəql edir. Əli (ə) buyurdu: Mənim Peyğəmbərin (s) hüzuruna çatmağım üçün səhər vaxtı müəyyən bir saat vardı. Əgər Həzrət (s) namaz qılan halda olsaydı təsbeh (subhanəllah) deyirdi. Bu da daxil olmaq üçün icazənin əlaməti idi. Yox, əgər namazda olmasaydı daxil olmağım üçün icazə verirdi"(۱).

۱۱۶. أخبرني محمّد بن قدامه, قال: حدثّنا جرير [بن عبد الحميد] عن المغيره [بن مقسم]، عن الحارث [بن يزيد]، عن أبى زرعه بن عمرو, قال: حدثّنا عبد الله بن نُجَىّ عن علىّ×, قال: «كانت لى من رسول الله | ساعةٌ من السحر آتيه فيها, إذا أتيتُه استأذنتُ فان وجدتُه يصلّى سَبَّح فدخلتُ، وان وجدتُه فارغاً اذن لى».

۱۱۶- Bu hədis də qabaqkı hədis kimidir. Nisai onu da başqa bir sənədlə həmin Abdullah ibn Nucəyydən belə nəql edir. Əli (ə) buyurdu: Mənim Peyğəmbərin (s) hüzuruna çatmağım üçün səhər vaxtı müəyyən bir saat vardı. Gəlib hüzuruna çatmaq üçün Həzrətdən (s) icazə istəyirdim. Əgər Həzrət (s) namazda olsaydı (mənim hüzuruna çatmağıma icazə verdiyini bildirmək üçün) təsbih (subhanəllah) deyərdi. Mən də daxil olardım. Və əgər namazda olmasaydı hüzuruna çatmağım üçün icazə verirdi"(۲).

۱۱۷. أخبرني محمّد بن عبيد بن محمّد، قال: حدثّنا [أبوبكر] ابن عيّاش عن المغيره، عن الحارث العكى, عن أبى نُجَىّ قال: قال علىّ×: «كان لى من النبىّ | مدخلان: مدخلٌ بالليل, ومدخل بالنهار، فكنتُ إذا دخلتُ



---

۱- [۱] . Yüz on beşinci hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c۲, s۱۳, hədis ۵۷۰; "Müsnədi Darəmi", c۲, s۲۸۴, hədis ۲۶۶۳; "Səhihi İbn Xəzimə", c۲, s۵۴, hədis ۹۰۴; "Müşkilül-asar", c۲, s۲۱۱, hədis ۱۸۹۹; "Sünəni Bihəqi", c۲, s۲۴۷.

۲- [۲] . Yüz on altıncı hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c۵, s۲۴۴, hədis ۲۵۶۶۷; "Səhihi İbn Xəzimə", c۲, s۵۴, hədis ۹۰۴; "Müsnədi Əhməd", c۲, s۴۳, hədis ۶۰۸; "Sünəni İbn Macə", c۲, s۱۲۲۲, hədis ۳۷۰۹; "Sünəni Nisai", c۳, s۱۲; "Kamil ibn Əddi", c۴, s۲۳۴; "Müşkilül-asar", c۲, s۲۱۰, hədis ۱۸۹۸; "Sünəni Bihəqi", c۲, s۲۴۷.

بالليل تَنَحنَح لی».

Əli (ə) buyurdu: Peyğəmbərin (s) hüzuruna çatmağım üçün iki müəyyən vaxt var -١١٧ idı. Biri gündüz digəri isə gecə vaxtı idi. Gecə vaxtı Peyğəmbərin (s) hüzuruna çatmaq üçün icazə istədikdə (icazə verməməsinin nişanəsi) Həzrətin (s) neçə dəfə qeyri-təbii öskürməsi idi"(١).

١١٨. أخبرنـا القـاسم بن زكريّا بن دينـار، قـال: حـدثّنا أبو اسـامه [حمّاد بن أسامه]، قال: حـدّثنى شـرحبيل ـ يعنى ابن مـدرك الجعفى، قال: حـدّثنى عبد الله بن نُجَىّ الحضـرمى عن أبيه ـ وكان صاحب مطهره علىّ× ـ قال: قال علىّ×: «كانت لى منزلةٌ من رسول الله | لم تكن لأحد من الخلائق، فكنتُ آتيه كلَّ سـحر فأقول: السلام عليك يا نبىّ الله، فان تَنحنَحَ أنصرفتُ إلى اهلى، وإلّا دخلتُ عليه».

Əli (ə) buyurdu: Mən Peyğəmbərin (s) yanında heç kimin sahib olmadığı xüsusi bir -١١٨ məqama malik idim. O fəzilət də bu idi ki, hər səhər vaxtı Peyğəmbərin (s) hüzuruna çatdıqda Əssəlamu ələykə ya Rəsuləllah (s) deyirdim. Əgər Həzrət (s) qeyri-təbii öskürsəydi evə qayıdırdım, əks halda hüzuruna çatırdım(٢).

١١٩. أخبرنـا محمّـد بن بشـار، قـال: حـدّثنى أبو المساور [الفضل بن مساور]، قال: حـدثّنا عوف [بن أبى جميله] عن عبـد الله بن عمرو بن هند الجملى، قال: قال علىّ×: «كنت إذا سألت رسول الله صلّى الله عليه وآله أعطانى، وإذا سكتُّ ابتدانى».

Əli (ə) buyurdu: (Peyğəmbərin (s) hüzuruna çatdığım zaman) O Həzrətdən (s) sual -١١٩ soruşurdum və Həzrət (s) cavab verirdi. Sakit olduğum zaman Həzrət (s) özü sözə başlayırdı"(٣).

səh:٨٧

---

١- [١]. Yüz on yeddinci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c٥, s٢۴۴, hədis ٢٥۶۶٧; "Müsnədi Əhməd", c٢, s۴٣, hədis ۶٠٨; "Sünəni İbn Macə", c٢, s١٢٢٢, hədis ٣٧٠٩; "Sünəni Nisai", c٢, s١٢; "Səhihi İbn Xəzimə", c٢, s٥۴, hədis ٩٠۴; "Kamil ibn Əddi", c۴, s٢٣۴; "Müşkilül-asar", c٢, s٢١٠, hədis ١٨٩٨; "Sünəni Bihəqi", c٢, s٢۴٧.

٢- [٢]. Yüz on səkkizinci hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c٢, s٣٥, hədis ٥٩٨, və s٧٧, hədis ۶۴٧, və s٢٠٧, hədis ٨۴٥, və s۴٢٥, hədis ١٢٩٠;"Sünəni Nisai", c٣, s١٢; "Səhihi İbn Xəzimə", c٢, s٥۴, hədis ٩٠٢; "Sünəni Bihəqi", c٢, s٢۴٨; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c٢, s۴٥٢, hədis ٩٨٢; "Fəraidus-Semtin", c١, s٢٠١, hədis ١٧٠.

Yüz on doqquzuncu hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c۶, s۳۶۸, . [۳] -۳ hədis ۳۲۰۶۱; "Sünəni Termizi", c۵, s۶۳۷, hədis ۳۷۲۲, və s۶۴۰, hədis ۳۷۲۹; "Mərasili İbn Əbi Hatəm", s۹۵, hədis ۱۶۸; "Müstədrəki Hakim", c۳, s۱۲۵; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c۲, s۴۵۴, hədis ۹۸۷; "Təhzibul-kəmal", c۱۵, s۳۷۲, hədis ۳۴۵۷; "Kənzül-ümmal", .c۱۳, s۱۲۰, hədis ۳۶۳۸۷

١٢٠. أخبرنا محمّد بن المثنّى، قال: حدثّنا أبو معاويه، قال: حدثّنا الاعمش عن عمرو بن مرّه، عن أبى البَخْترى، عن علىّ× قال: «كنتُ إذا سألتُ أُعطيتُ وإذا سَكتُّ اُبتديتُ». ١٢١. أخبرنا يوسف بن سعيد, قال: حدثّنا حجّاج [بن محمّد الأعور] عن [عبد الملك] بن جريج، قال: حدثّنا أبو حرب [بن أبى الأسود] عن أبى الاسود وحدثّنا رجل آخر عن زاذان، قالا: قال: علىّ×: «كنت واللهِ؛ إذا سألتُ اُعطيتُ وإذا سكتُّ اُبتديتُ».

١٢٠- Əli (ə) buyurdu: "(Peyğəmbərin (s) hüzuruna çatdığım zaman) sual soruşurdum və cavab eşidirdim. Sakit olduğum zaman Həzrət (s) özü sözə başlayırdı"(١).

١٢١. أخبرنا يوسف بن سعيد, قال: حدثّنا حجّاج [بن محمّد الأعور] عن [عبد الملك] بن جريج، قال: حدثّنا أبو حرب [بن أبى الأسود] عن أبى الاسود وحدثّنا رجل آخر عن زاذان، قالا: قال: علىّ×: «كنت واللهِ؛ إذا سألتُ اُعطيتُ وإذا سكتُّ اُبتديتُ».

١٢١- Bu hədis də qabaqkı hədislər kimidir. Nisai onu da başqa bir sənədlə belə nəql edir. Əli (ə) buyurdu: "Allaha and olsun hər zaman ]Rəsulullahdan (s)[ sual soruşurdum, cavab eşidirdim. Sakit olduğum zaman Həzrət (s) özü sözə başlayırdı"(٢).

### Əli Peyğəmbərin (s) çiyinlərinə çıxmış

١٢٢. أخبرنا احمد بن حرب، قال: حدثّنا اسباط [بن محمّد] عن نعيم بن حكيم المدائنى، قال: حدثّنا أبو مريم, قال: قال على: «انطلقت مع رسول الله | حتى أتيَنا الكعبَة، فصَعِد رسولُ الله | على منكبى فنَهضتُ به، فلمّا رأى رسول الله | ضَعفى, قال لى: اجلس فجلست، فنزل نبىّ | [و جلس لى]، فقال: اصعد على منكبى، فنهض بى رسولُ الله | فانه ليُخَيِّلنى أنى لو شئت لنلتُ افقَ السماء، فصَعدتُ على الكعبه وعليها تمثال من صفرٍ أو نُحاس، فجعلت اُعالجه لاُزيله يميناً وشمالاً وقداماً ومن بين يديه ومن خلفه حتّى اذا استَمكنْتُ منه، قال نبىّ الله |: اقذفه. فقذفتُ به, فكسرتُه كما تُكسَرُ القواريرُ، ثمّ نزلتُ فانطلقت أنا ورسول الله صلّى الله عليه وآله نستبقُ حتّى توارينا بالبيوت خشيةَ أن يلقانا أحد من النّاس».

١٢٢ - Əli (ə) buyurdu: Rəsulullah (s) ilə Kəbəyə getdik. ]Kəbənin kənarında əyləşdim.[ Rəsulullah (s) mənim çiyinlərimə çıxdı. Ayaq üstə durub Həzrəti (s) qalxızdım.



---

١- [١]. Yüz iyirminci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c٦, s٣٦٨, hədis ٣٢٠٦٠; "Əl-mə`rifətü vət-tarix", c٢, s٥٤٠; "Mənaqibi Kufi", c٢, s٤٦, hədis ٥٣٥; "Hilyətul-əvliya", c١, s٦٨, və c٤, s٣٨٢; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c٢, s٤٥٤, hədis ٩٨٥.

٢- [٢]. Yüz iyirmi birinci hədis başqa mənbələrdə: "Müsnədi Təyalisi", s٢٥, hədis ١٨٠; "Təbəqati İbn Sə`d", c٢, s٣٨٨; "Fəzaili Əhməd", s١٥٤, hədis ٢٢١; "Ənsabul-əşraf", c١,

Rəsulullah (s) mənim zəifliyimi hiss edib buyurdu: "Əyləş" mən də əyləşdim. Həzrət (s) çiyinlərimdən aşağı düşdü və oturaraq buyurdu: "Mənim çiyinlərimə çıx." Rəsulullah (s) ayaq üstə durub məni qalxızdı. Elə bil əlimi səma üfüqünə vuracaq qədər yuxarı qalxmışdım. Kəbənin üstünə çıxdım. Onun üstündə misdən bir heykəl var idi. Onu yerindən qopartmaq üçün sağa-sola, dala-qabağa çəkdim. Onu yerindən qopardan kimi Peyğəmbər (s) buyurdu: "Onu at." Mən də atdım. Sonra onu büllur kimi sındırıb tikə-tikə etdim. Aşağı enib Rəsulullah (s) ilə birlikdə camaat bizi görmədən evlərdə .(gizlənmək üçün tələsik getdik(١

**Əli behişt qadınlarının sərvəri Fatimənin həyat yoldaşı**

١٢٣. أخبرنا الحسين بن حريث، قال: أخبرنا الفضل بن موسى، عن الحسين بن واقد، عن عبد الله بن بريده, عن أبيه قال: خطب أبو بكر وعمر فاطمةَ، فقال رسول الله صلّى الله عليه وآله: «انها صغيره». فخطبها عليّ× فزوَّجَها منه.

Əbu Bəkr və Ömər Fatiməyə elçilik etdilər. Rəsulullah (s) buyurdu: "O hələ - ١٢٣ .(kiçikdir". Sonra Əli elçilik etdi. Peyğəmbər (s) də onu Əlinin həyat yoldaşı etdi(٢

١٢٤. أخبرنا اسماعيل بن مسعود، قال: حدثّنا حاتم بن وردان، قال: حدثّنا أيوب السختياني عن أبي يزيد المدني، عن أسماء بنت عميس, قالت: كنتُ في زفاف فاطمةَ بنتِ رسول الله|، فلمّا أَصبَحْنا



---

Yüz iyirmi ikinci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c٧, s٥٠٤, hədis . [١] -١ ٣٦٨٩٦; "Müsnədi Əhməd", c٢, s٧٣, hədis ٦٤٤; "Təhzibel-asari Təbəri", s٢٣٦-٢٣٧, hədis ٣١-٣٣; "Müsnədi Əbu Yə`la", c١, s٢٥١, hədis ٢٩٢; "Mənaqibi Kufi", c٢, s٦٠٦, hədis ١١٠٥; "Müstədrəki Hakim", c٢, s٣٦٦; "Tarixi Bağdad", c١٣, s٣٠٢, hədis ٧٢٨٢; "Məvzei əvham", c٢, s٤٣٢; "Mənaqibi İbn Məğazili", s٢٠٢, hədis ٢٤٠; "Ərbəini Xüzai", s٦٠, hədis ١٨; "Mənaqibi Xarəzmi", s٧١; "Kifayətüt-Talib", s٢٥٧; "Mənaqibi İbn Şəhr Aşub", c٢, s١٣٥; ."Fəraidus-Semtin", c١, s٢٤٩, hədis ١٩٣; "Kəşfül-əstar", c٢, s١٢٨, hədis ٢٤٠١

Yüz iyirmi üçüncü hədis başqa mənbələrdə: "Təbəqati İbn Sə`d", c٨, s١٩; Fəzaili . [٢] -٢ Əhməd", s١١٨, hədis ١٧٣; "Sünəni Nisai", c٦, s٦٢; "Mənaqibi Kufi", c١, s٢٩٠, hədis ٢١٠; Səhihi İbn Həbban", c١٥, s٣٩٣, hədis ٦٩٤٤, və s٣٩٩, hədis ٦٩٤٨; "Möcəmi kəbir Təbərani", c٤, s٣٤, hədis ٣٥٧١; "Fəzaili Fatimə İbn Şahin", s٨٧, hədis ٣٧; "Müstədrəki Hakim", c٢, s١٦٧; "Tarixi Bağdad", c١٤, s٣٦٣, hədis ٧٦٩١; "Mənaqibi Xarəzmi", s٣٣٥, hədis ٣٥٦-٣٦٤;

جاء النبيّ صلّى الله عليه وآله, فضرب البابَ، ففتَحتْ له أمّ أيمن البابَ فقال: «يا أمّ أيمن, أدعى لى أخى». قالت: هو أخوك وتُنكِحُه؟! قال: «نعم, يا أمّ أيمن». وسمعنَ النساء صوت النبيّ | فَتَنَحَّيْنَ, قالت: وأختبأتُ أنا فى ناحيه، قالت: فجاء علىّ×, فدعا له رسول الله | ونَضَح عليه من الماء ثمّ قال: «أدعوا لى فاطمةَ». فجائت خرقه من الحياء, فقال لها: «قد أنكحتُكِ أحبَّ أهل بيتى». ودعا لها ونَضَح علىّ×اً من الماء, فخرج رسول الله صلّى الله عليه وآله فرأى سواداً, فقال: «من هذا»؟ قلتُ: أسماء. قال: «ابنه عميسٍ»؟ قلتُ: نعم. قال: «كنتِ فى زفاف فاطمةَ بنتِ رسول الله تُكرمينَها؟ قلتُ: نعم. قالت: فدعا لى».

Ümeysin qızı Əsma deyir: Rəsulullahın (s) qızı Fatimənin toy gecəsində oradaydım. -۱۲۴ Səhər açılan kimi Peyğəmbər (s) gəlib qapını döydü.] Rəsulullahın (s) həyat yoldaşlarından biri[ Ümmü Əymən qapını açdı. Həzrət (s) buyurdu: "Ay Ümmü Əymən! Qardaşım Əlini mənim yanıma çağır. Ümmü Əymən dedi: O sizin qardaşınızdırsa qızınızı necə ona veribsiniz?! Buyurdu: "Bəli ay Ümmü Əymən!] O mənim qardaşım və damadımdır [" Bu zaman qadınlar Peyğəmbərin (s) səsini eşidib hərəsi bir tərəfə getdilər. Ümeysin qızı Əsma deyir: Mən də bir tərəfdə gizləndim. Əli gələn kimi Peyğəmbər (s) ona dua edib, su səpdikdən sonra buyurdu: "Fatiməni mənim yanıma çağır." Elə bil ki, həyadan bir parça gəldi. Həzrət (s) ona buyurdu: "Səni Əhli-beytimin ən sevimli şəxsi ilə evləndirdim." Onun üçün dua edib, su səpdi. Rəsulullah (s) evdən çıxmaq istədikdə küncdə bir qaraltı görərək bunun kim olduğunu soruşdu? Əsma olduğumu söylədim. Ümeysin qızı olduğumu soruşdu? Bəli dedim. Həzrət (s) buyurdu: "Rəsulullahın (s) qızı Fatimənin zifaf gecəsində ona ehtiram etmək üçün buradasanmı?" Bəli dedim. Həzrət (s) mənim üçün dua etdi(۱).

۱۲۵. أخبرنا زكريّا بن يحيى، قال: حدثّنا محمّد ابن صُدران، قال: حدثّنا سهيل بن خلاد العبدى، قال: حدثّنا محمّد بن سواء عن سعيد بن أبى عروبه، عن ايّوب السختيانى، عن عكرمه، عن ابن عبّاس



---

۱- [۱] . Yüz iyirmi dördüncü hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbdür-rəzzaq", c۵, s۴۸۵, hədis ۹۷۸۱; "Təbəqati İbn Sə`d", c۸, s۲۳-۲۵; Fəzaili Əhməd", s۵۶۸; "Əz-zür-riy-yətüt-tahirə", s۹۶, hədis ۸۸; "Mənaqibi Kufi", c۲, s۲۱۳, hədis ۶۸۲, və s۶۸۳, hədis ۲۱۶, və s۶۸۴, hədis ۲۱۸; "Müstədrəki Hakim", c۳, s۱۵۷-۱۵۹; "Tərcümətil-İmam Əli min Tarix Dəmeşq", c۱, s۲۶۶, hədis ۳۱۱; "Əl-mətalibul-aliyə", c۴, s۶۰, hədis ۳۹۵۹, və s۶۱, hədis ۳۹۶۱.

قال: لمّا زوّج رسولُ الله | فاطمهَ من عليّ× كان فيما أَهدى معها سـريراً مشروطاً, ووسادهً من أَدْم حشوُها ليف, وقربهً قال: وجاؤوا ببطحاء الرمل, فَبَسـطوه فى البيت، وقال لعلى×: «إذا أتيتَ بها فلا تقربها حتّى آتيک». فجاء رسول الله |, فدّق البابَ، فخرجَتْ إليه أمّ أيمن, فقـال لهـا: «أَثَمَّ أخى»؟ فقـالت: وكيف يكون أخوک وقـد زوّجتَه ابنَتـک؟ قـال: «فـانه أخى». قال: ثمّ أقبل [على الباب ورأى سواداً, فقال: «من هـذا»؟ قالت: أسـماءُ بنتُ عميسٍ، فأقبل] عليها فقال لها: «جئتِ تُكرمين ابنهَ رسول الله»؟ قالت: نعم. فدعا لها, وقال لها: خيراً, ثمّ دخل رسول الله |. قال: وكان اليهود يؤاخِذون الرجل عن امرأته إذا دخل بها، قال: فـدعا رسول الله | بتور من ماء, فتفل فيه وعوّد فيه، ثمّ دعا عليّ×اً فرشّ من ذلک الماء على وجهه وصـدره وذراعيه، ثمّ دعا فاطمه فأقبلت تَعثر فى ثوبها حياءً من رسول الله | ففعل بها مثل ذلک, ثمّ قال لها: «انى والله؛ ما آلوتُ أن أُزوّجَکِ خير أهلى». ثمّ قام فخرج.

Abdullah ibn Abbas deyir: Rəsulullah (s) Fatiməni Əli ilə evləndirən zaman ona - ١٢٥ xurma ağacının yarpağıyla toxunmuş bir taxt, içi xurma lifləri ilə doldurulmuş dəridən .bir balış və bir də müşk ətiri cehiz verdi

O belə davam edir: Bir qədər narın qum gətirib, otağa səpdilər. Peyğəmbər (s) Əliyə buyurdu: "Elə ki, zifaf üçün həyat yoldaşının yanına gəldin, mən sənin yanına gəlməmiş onunla yaxınlıq etmə". Rəsulullah (s) gəlib qapını döydü. ]Rəsulullahın (s) həyat yoldaşlarından biri[ Ümmü Əymən qapıya tərəf getdi. Həzrət (s) ondan soruşdu: "Qardaşım buradadırmı?" Ümmü Əymən dedi: O sizin qardaşınızdırsa qızınızı necə ona ."veribsiniz?! Buyurdu: "Bəli o mənim qardaşımdır

Abdullah ibn Abbas deyir: Sonra Həzrət (s) üzünü qapıya çevirdikdə bir qaraltı görüb onun kim olduğunu soruşdu? Ümmü Əymən Ümeysin qızı Əsma olduğunu söylədi. Həzrət (s) ona tərəf gedib buyurdu: "Rəsulullahın (s) qızına ehtiram etmək üçün gəlmisənmi? Bəli-dedi. Həzrət (s) onun üçün dua edərək, yaxşı söz dedi. Sonra evə .daxil oldu

Abdullah ibn Abbas deyir: Yəhudilərin adəti idi ki, sehr edib kişini qadını ilə yaxınlıq etməyə qoymazdılar. Rəsulullah (s) bir kiçik qabda su istədi. Suya ağzını vurub "hifz" duası oxudu. Sonra Əlini çağırıb suyu onun üzünə, sinəsinə və əllərinə səpdi. Sonra (Fatiməni çağırdı. O həyasından az qalırdı libasına ilişib yerə dəysin. Həzrət (s

ona da bu cürə su səpdikdən sonra buyurdu: "Allaha and olsun səni öz əhlimin ən yaxşısı ilə evləndirməkdə səhlənkarlıq etməmişəm". Sonra durub getdi(۱).

۱۲۶. أخبرنی عمران بن بکار بن راشد، قال: حدثّنا أحمد بن خالد، قال: حدثّنا محمّد [بن اسحاق] عبد الله بن أبی نجیح، عن أبیه: أن معاویه ذکر علیّ× بن أبی طالب, فقال سعد بن أبی وقّاsəh: والله؛ لان تکون لی احدی من خلاله الثلاث أحبّ إلیّ من أن یکون لی ما طلعت علیه الشمس، لان یکون قال لی ما قال له حین ردّه من تبوک: «أما ترضی أن تکون منّی بمنزله هارون من موسی إلّا أنه لا نبیّ بعدی» أحبّ إلیّ أن یکون لی ما طلعت علیه الشمس، ولان یکون قال لی ما قال فی یوم خیبر: «لأُعطِیَنّ الرایهَ رجلًا یُحِبّ الله ویُحِبّه الله رسولُه, یَفتح اللهُ علی یدیه لیس بفرّار» أحبّ إلیّ من أن یکون لی ما طلعت علیه الشمس. ولان أکون کنتُ صهرَه علی ابنته لی منها من الولد ما لَه أحبّ إلیّ من أن یکون لی ما طلعت علیه الشمس.

۱۲۶ - Müaviyə Əli ibn Əbi Talibdən pisliklə yad etdi. Səd ibn Əbi Vəqqas (ona) dedi: Allaha and olsun əgər mən Əlinin üç məxsus xüsusiyyətindən birinə malik olsaydım mənim üçün günəş saçan hər bir şeydən daha sevimli idi:

۱. [ Rəsulullah (s)[ Təbuk döyüşünə gedərkən Əlini aparmayaraq ona buyurdu: " Sən istəməzsən ki, mənimlə olan nisbətin Harunun Musa ilə olan nisbəti kimi olsun? Yeganə fərq buradadır ki, məndən sonra Peyğəmbər olmayacaq". Həzrət (s) əgər bu cümləni mənim barəmdə buyursaydı mənim üçün günəş saçan hər bir şeydən daha sevimli idi.

۲. [ Rəsulullah (s) [Xeybər günündə buyurdu: " Bu bayrağı Allah və rəsulunu (s) sevən və habelə Allah və rəsulunun (s) da sevdiyi bir şəxsə verəcəm. Allah qələbəni onun əli ilə həyata keçirdəcək. O heç vaxt döyüşdən qaçmaz". Həzrət (s) əgər bu cümləni mənim barəmdə buyursaydı mənim üçün günəş saçan hər bir şeydən daha sevimli idi.

۳. Mən əgər Rəsulullahın (s) damadı olsaydım və onun qızından olan övladlar mənim olsaydı mənim üçün günəş saçan hər bir şeydən daha sevimli idi(۲).



---

۱- [۱] . Yüz iyirmi beşinci hədis başqa mənbələrdə: "Bu hədisin mənbələri də qabaqkı hədisin mənbələri kimidir.

۲- [۲] . Yüz iyirmi altıncı hədis başqa mənbələrdə: "Fəzaili Əhməd", s۱۴۸, c۲۱۵; "Kitabus-sünnə", s۵۸۷, hədis ۱۳۴۴, və s۵۹۴, hədis ۱۳۸۶; "Mənaqibi Kufi", c۲, s۵۴۸, hədis ۱۰۵۸; "Əl-

### Rəsulullahın (s) qızı Fatimə behişt qadınlarının sərvəri

۱۲۷. أخبرنا محمّـد بن بشار، قال: حـدثّنا عبد الوهاب [بن عبد المجيد]، قال: حدثّنا محمّد بن عمرو [الليثى] عن أبى سـلمه، عن عـائشه قـالت: مرض رسول الله | فجـاءت فـاطمهُ فـأكبّتْ على رسول الله | فسارّها, فبكَتْ، ثمّ أكبّتْ عليه, فسارَّها فضَـحكَتْ، فلمّا توفّى النبىّ صلّى الله عليه وآله سألتُها فقالت: «لمّا أَكببتُ عليه أخبرنى أنه ميّت من وجعه ذلك فبكيت، ثمّ أكببتُ عليه فأخبرنى أنى أسرعُ أهل بيتى [به] لحوقاً، وانى سيّدهُ نساء أهل الجنّه إلّا مريم بنتَ عمران, فرفعتُ رأسى فضّحكتُ».

Ayişə deyir: Rəsulullah (s) xəstələnib] yatağa düşdü[. Fatimə gəlib özünü Həzrətin ۱۲۷- (s) üstünə atdı. Həzrət (s) ona bir sirr dedi o da ağladı. Sonra yenə özünü Həzrətin (s) üstünə atdı. Həzrət (s) ona başqa bir sir də dedi. Fatimə bu dəfə güldü. Peyğəmbər (s) dünyasın dəyişdikdən sonra Fatimədən o sirrin nə olduğunu soruşdum? Belə dedi: "Birinci dəfə Rəsulullah (s) bu xəstəliyin ardından gələn vəfatından xəbər verdi. Mən də ağladım. İkinci dəfədə isə mənə Həzrətin (s) Əhli-beytindən birinci mənim ona qoşulacağımı və habelə mənim İmranın qızı Məryəmdən başqa bütün behişt qadınlarının sərvəri olduğumu xəbər verdi. Mən də başımı qaldırıb güldüm"(۱).

۱۲۸. أخبرنى هلال بن بشـر، قال: حدثّنا محمّد بن خالد، قال: حدثّنا موسى بن يعقوب, قال: حدّثنى هاشم بن هاشم عن عبد الله بن وَهْب [بن زمعه] أن أمّ سلمه أخبَرتْه: أن رسول الله | دعا فاطمهَ فناجاها فبكت، ثمّ حدّثها فضحكت، قالت أمّ سلمه: فلمّا توفّى رسول الله | سألتُهـا عن بكائها وضـحكِها؟ فقالت: «أخبرنى رسول الله | أنه يموت فبكيّت, ثمّ أخبرنى رسول الله | أنى سيّده نساء أهل الجنّه بعد مريم بنت عمران فضحكتُ».

Rəsulullahın (s) həyat yoldaşlarından biri[ Ümmü [-۱۲۸



---

[۱] -۱ Yüz iyirmi yeddinci hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c۶, s۳۹۱, . hədis ۳۲۲۶۰; "Sünəni Termizi", c۵, s۷۰۰, hədis ۳۸۷۲; "Ahad və Məsani", c۵, s۳۵۷-۳۵۸, hədis ۲۹۴۲, ۲۹۴۴-۲۹۴۵, və s۳۶۸-۳۶۹, hədis ۲۹۶۹-۲۹۷۰; "Əvaili İbn Əbi Asim", s۳۲, hədis ۷۷, və s۵۴, hədis ۱۵۱; "Sünəni kübra", Nisai c۵, s۹۵, hədis ۸۳۶۶, və s۹۶, hədis ۸۳۶۹; "Müsnədi Əbu Yə`la", c۱۲, s۱۲۲, hədis ۶۷۵۵; "Əz-zür-riy-yətüt-tahirə", s۱۴۰-۱۴۱, hədis ۱۷۵-۱۷۷, və s۱۴۶, hədis ۱۸۵; "Səhihi İbn Həbban", c۱۵, s۴۰۲, hədis ۶۹۵۲; "Möcəmi kəbir Təbərani", c۲۲, s۴۱۷-۴۲۰, hədis ۱۰۳۰, ۱۰۳۱, ۱۰۳۴-۱۰۳۶; "Xisali Səduq", s۵۵۵, (bab Ərbəin), hədis ۳۰; "Müşkilul-asar", c۱, s۳۵, hədis ۹۸; "Fəzaili Fatimə ibn Şahin", s۵۴-۵۶, hədis ۴-۶; "Hilyətul-əvliya", c۲, s۴۰; "Əmaliyi Tusi", s۴۰۰, hədis ۸۹۲; "Dəlaili Bihəqi", c۷, s۱۶۶; "Mənaqibi İbn

sələmə deyir: Rəsulullah (s) ]xəstəlik yatağında[ Fatiməni çağırıb ona bir sirr dedi. O da ağladı. Sonra Fatiməyə başqa bir söz dedi. O da güldü. Ümmü sələmə deyir: Peyğəmbər (s) dünyasın dəyişdikdən sonra ondan ağlamaq və gülməyinin səbəbini soruşdum? Belə dedi: Rəsulullah (s) məni öz vəfatından xəbərdar etdi. Mən də ağladım. Sonra məni İmranın qızı Məryəmdən başqa bütün behişt qadınlarının sərvəri olduğumdan xəbərdar etdi. Mən də güldüm"(١).

١٢٩. أخبرنا اسحاق بن ابراهيم [ابن راهويه]، قال: أخبرنا جرير [بن عبـد الحميـد] عن يزيـد [بن أبى زياد]، عن عبد الرحمان بن أبى نُعم، عن أبى سعيد قال: قال رسول الله |: «الحسن والحسين سيّدا شباب أهل الجنّه وفاطمةُ سيّدةُ نساءِ أهل الجنّه إلّا ما كان من مريم ابنه عمران».

١٢٩ - Rəsulullah (s) buyurdu: "Həsən və Hüseyn behişt cavanlarının sərvərləridir. Fatimə isə İmranın qızı Məryəmdən başqa bütün behişt qadınlarının sərvəridir(٢).

**Fatimə İslam ümməti qadınlarının sərvəri**

١٣٠. أخبرنا محمّـد بن منصور [الطوسى]، قال: حـدثّنا الزبيرى محمّـد بن عبـد الله [بن الزبير أبو أحمد]، قال: حدثّنا أبو جعفر ــ واسمه محمّد بن مروان ــ، قال: حدّثنى أبو حازم [سلمه بن دينار]، عن أبى هريره قال: أبطأ رسول الله | عنّا يوماً صَدْرَ النهار، فلمّا كان العشيّ قال له قائلُنا: يا رسول الله قد شقّ علينا لم نَرَك اليوم. قال: «ان ملكاً من السّماء لم يكن رانى فاستأذن الله فى زيارتى، فأخبرنى ــ أو: بشّرنى ــ أن فاطمةَ ابنتى سيّدةُ نساء أمّتى، وان حسناً وحسيناً سيّدا شباب أهل الجنّه».

١٣٠ - Əbu Hüreyrə deyir: Səhər Rəsulullahı (s) görmədim. Axşam vaxtı bizdən biri dedi: Ya Rəsulullah (s)! Sizi görmədiyimiz üçün bu gün bizə çox çətin keçdi. Həzrət (s) buyurdu: "İndiyə qədər məni görməmiş səmadan olan bir



---

١- [١] . Yüz iyirmi səkkizinci hədis başqa mənbələrdə: "Sünəni Termizi", c٥, s٧٠١, hədis ٣٨٧٣; "Ahad və Məsani", c٥, s٣۶٥, hədis ٢٩۶۴; "Müsnədi Əbu Yə`la", c١٢, s١١٠, hədis ۶٧۴٣, və s٣١٢, hədis ۶٨٨۶; "Əz-zür-riy-yətüt-tahirə", s١۴۴, hədis ١٨٢; "Möcəmi kəbir Təbərani", c٢٢, s۴٢٢, hədis ١٠٣٩; "Fəzaili Fatimə ibn Şahin", s٥٨, hədis ٨.

٢- [٢] . Yüz iyirmi doqquzuncu hədis başqa mənbələrdə: "Müsnədi Əhməd", c١٨, s١۶١, hədis ١١۶١٨, və s٢٧٩, hədis ١١٧٥۶; "Fəzaili Əhməd", s٧٥٧, hədis ١٣٣١, və s٧٧١, hədis ١٣۶٠; "Sünəni Termizi", c٥, s۶٥۶, hədis ٣٧۶٨; "Müsnədi Əbu Yə`la", c٢, s٣٩٥, hədis ١١۶٩;

"Mənaqibi Kufi", c۲, s۱۹۳, hədis ۶۶۵, və s۲۲۳, hədis ۶۸۷; "Müstədrəki Hakim", c۳, s۱۵۴; ."İstiab", c۴, s۱۸۹۴; "Əmaliyi Tusi", s۲۴۸, hədis ۴۳۶

mələk məni ziyarət etmək üçün Allahdan icazə istədi. (Gəlib) mənə belə bir xəbər ya müjdə verdi: Qızım Fatimə bu ümmətin qadınlarının sərvəri, Həsən və Hüseyn isə behişt cavanlarının sərvərləridir"(١).

١٣١. أخبرنا أحمد بن سليمان، قال: حدثّنا أبو نعيم الفضل بن دكين, قال: حدثّنا زكريّا [بن أبى زائده] عن فراس [بن يحيى]، عن الشعبى، عن مسروق، عن عائشه, قالت: أقبلتْ فاطمةُ [تمشى] كان مشيتَها مشيةُ رسول الله | فقال: «مرحباً بابنتى». ثمّ أجلَسَها عن يمينه أو عن شماله، ثمّ أسرّ إليها حديثاً فبكَتْ، فقلتُ لها: استَخصَّكِ رسول الله | بحديثه وتَبكين؟ ثمّ أنه أسرّ إليها حديثاً فَضَحَكَتْ، فقلتُ لها: ما رأيتُ كاليوم فرحاً أقربَ من حزن، وسألتُها عمّا قال؟ فقالت: «ما كنتُ لأُفشى سرَّ رسول الله |». حتّى اذا قُبِض سألتُها فقالت: «انه أسرّ إلىّ فقال: أن جبريل كان يعارضُنى بالقران كلَّ سنةٍ مرّةً، وانه عارَضنى به العامَ مرّتين, ولا أرانى إلّا قد حَضَر أجلى وانكِ أوّلُ أهل بيتى لحوقاً بى, ونعم السلف أنا لكِ. _ قالت: _ فبكيت لذلك, ثمّ قال: أما ترضين أن تكونى سيّدةَ نساء هذه الأمّه, أو: نساء المؤمنين. _ قالت: _ فضحكت».

١٣١ - Ayişə deyir: Fatimə gəldi. Yol getməyi Rəsulullahın (s) yol getməyi kimi idi. Rəsulullah (s) buyurdu: "Afərin mənim qızıma". Sonra onu sağ ya sol tərəfində əyləşdirib bir söz dedi. Fatimə ağladı. Ona dedim: Rəsulullah (s) sözlərini yalnız sənə söyləyir. Sən isə sevinmək əvəzinə ağlayırsan? Sonra Həzrət (s) yenə ona bir söz dedi. Fatimə bu dəfə güldü. Ona dedim: Sevincin qəmə bu qədər yaxın olduğu bir günü görməmişdim. Sonra Həzrətin (s) ona nə dediyini soruşdum? Mən Rəsulullahın (s) sirrini faş etmərəm dedi. Peyğəmbər (s) dünyasını dəyişdikdən sonra yenə ondan o sirrin nə olduğunu soruşdum? Həzrət (s) mənə belə buyurdu dedi: "Cəbrayıl Quranı hər il bir dəfə mənimlə qovuşdururdu (tətbiq edirdi). Amma bu il iki dəfə qovuşdurdu (tətbiq etdi). Məncə bu vəfatımın yaxınlaşmasına bir nişanədir. Sən Əhli-beytimdən mənə qoşulan birinci şəxs olacaqsan. Mən sənin üçün nə yaxşı



---

١- [١] . Yüz otuzuncu hədis başqa mənbələrdə: "Müsənnif ibn Əbi Şibə", c٦, s٣٨١, hədis ٣٢١٦٧, və s٣٩١, hədis ٣٢٢٦١; "Müsnədi Əhməd", c٣٨, s٣٥٣, hədis ٢٣٣٢٩; "Tarixi kəbiri Buxari", c١, s٢٣٢, hədis ٧٢٨; "Sünəni Termizi", c٥, s٦٦٠, hədis ٣٧٨١; "Ahad və Məsani", c١٥, s٤١٣, hədis ٦٩٦٠; "Möcəmi kəbir Təbərani", c٣, s٣٦-٣٨, hədis ٣٦٠٩-٣٦٠٤, və c٢٢, s٤٠٢-٤٠٣, hədis ١٠٠٥-١٠٠٦; "Müstədrəki Hakim", c٣, s١٥١; "Tarixi Bağdad", c٢, s٣٧٢, hədis ٣٣٩٧; "Əmaliyi Tusi", s٨٤, hədis ١٢٧; "Təhzibul-kəmal", c٢٦, s٣٩١, hədis ٥٥٩٦.

irəlidə gedənəm". Ayişə deyir: Fatimə dedi: Buna görə ağladım. Sonra Rəsulullah (s) buyurdu: "Sən bu ümmətin ya mömin qadınlarının sərvəri olmağa razı deyilsən"? .(Fatimə bunu eşidən kimi güldüm dedi(۱

۱۳۲. أخبرنا محمّد بن معمّر [البحرانی]، قال: حدثّنا أبو داود [الطیالسی]، قال: حدثّنا أبو عوانه عن فراس، عن الشعبی، عن مسروق قال: أخبرتْنی عائشه, قالت: كنّا عند رسول الله | جمیعاً ما تغادر منّا [امرأه] واحده، فجاءت فاطمهُ تمشی, ولا والله؛ أن تخطئ مشیتُها من [مشیهَ] رسول الله | حتّی أنتهت إلیه فقال: «مرحباً بابنتی». فأقعدها عن یمینه أو عن یساره، ثمّ سارّها بشئ فبكَتْ بكاءً شدیداً, ثمّ سارّها بشئ فضحكَتْ، فلمّا قام رسول الله | قلتُ لها: خَصّكِ رسول الله صلّی الله علیه وآله من بیننا بالسرار وانتِ تبكینَ؟! أخبرینی ما قال لكِ؟ قالت: «ما كنتُ لأُفشی علی رسول الله | سِرَّه» فلمّا توفّی قلتُ لها: أسألكِ بالّذی [لی] علیك من الحقّ ما الّذی سارّكِ به رسول الله |؟ قالت: «امّا الان: فنعم، سارّنی أمّا مرّته الأولی فقال: أن جبریل كان یعارضُنی بالقران فی كلّ عام مرّهً, وانه عارَضنی به العامَ مرّتین، ولا أری الأجل إلّا قد اقترَبَ, فاتّقی الله واصبری. [فبكیت], ثمّ قال: یا فاطمه؛ أما ترضینَ أنك سیّدهُ نساء هذه الأمّه أو: نساء العالمین. فَضَحكتُ».

Bu hədis də qabaqkı hədis kimidir. Nisai onu da başqa bir sənədlə Ayişədən belə - ۱۳۲ nəql edir: Hamımız istisnasız Rəsulullahın (s) hüzurunda idik. Fatimə gəldi. Allaha and olsun yol getməyi Rəsulullahın (s) yol getməyi kimi idi. Rəsulullahın (s) yanına gələn kimi Həzrət (s) ona buyurdu: "Afərin mənim qızıma". Sonra onu sağ ya sol tərəfində əyləşdirib bir söz dedi. Fatimə şiddətlə ağladı. Sonra Həzrət (s) yenə ona bir söz dedi. Fatimə bu dəfə güldü. Peyğəmbər (s) getdikdən sonra ona dedim: Rəsulullah (s) sirrini ?yalnız sənə söyləməsinə baxmayaraq sevinmək əvəzinə ağlayırsan



---

Yüz otuz birinci hədis başqa mənbələrdə: "Təbəqati kübra İbn Sə`d", c۲, s۲۴۷, və . [۱] -۱ c۸, s۲۶; "Müsnədi İbn Rahəviyyə", c۴, s۲۴۵; "Müsnədi Əhməd", c۴۴, s۹, hədis ۲۶۴۱۳; "Səhih Buxari", c۴, s۲۴۷-۲۴۸, hədis ۳۶۲۵; "Səhih Müslim", c۴, s۱۹۰۵, hədis ۲۴۵۰; "Sünəni İbn Macə", ", c۱, s۵۱۸, hədis ۱۶۲۱; "Ahad və Məsani", c۵, s۳۵۷, hədis ۲۹۴۳; "Əvaili İbn Əbi Asim", s۳۲, hədis ۷۶; "Sünəni kübra", Nisai c۵, s۹۶; "Müsnədi Əbu Yə`la", c۱۲, s۱۱۱, hədis ۶۷۴۴-۶۷۴۵, və s۳۱۳, hədis ۶۸۸۷; "Əz-zür-riy-yətüt-tahirə", s۱۴۳, hədis ۱۸۰; "Müşkilul-asar", c۱, s۳۵, hədis ۹۷; "Mənaqibi Kufi", c۱, s۳۹۲, hədis ۳۱۴, və c۲, s۲۰۸, hədis ۶۷۹; "Möcəmi kəbir Təbərani", c۲۲, s۴۱۸, hədis ۱۰۳۲; "Əmaliyi Səduq", s۶۹۲, hədis ۹۴۸; ."Dəlaili Bihəqi", c۶, s۳۶۴; "Əmaliyi Tusi", s۳۳۳, hədis ۶۶۹; "Hilyətul-əvliya", c۲, s۴۰

Həzrətin (s) ona nə söylədiyini mənə deməsini istədim. Fatimə mən Rəsulullahın (s) sirrini faş etmərəm dedi. Peyğəmbər (s) dünyasını dəyişdikdən sonra ona dedim:Səni ?boynunda haqqı olan şəxsə and verirəm Rəsulullah (s) səninlə nə pıçıltı etdi

İndi Həzrətin (s) mənə nə buyurduğunu deyəcəm. Həzrət (s) mənə belə buyurdu: "Cəbrayıl Quranı hər il bir dəfə mənimlə qovuşdururdu (tətbiq edirdi). Amma bu il iki dəfə qovuşdurdu (tətbiq etdi). Məncə bu vəfatımın yaxınlaşmasına bir nişanədir. Qızım təqvalı və səbirli ol". Mən ağladım. Sonra yenə buyurdu: Ay Fatimə! Sən bu ümmətin ya dünya qadınlarının sərvəri olmağa razı deyilsən"? Fatimə bunu eşidən kimi güldüm .(dedi(١

### Fatimə Rəsulullahın (s) vücudunun parası

١٣٣. أخبرنا قتيبه بن سعيد، قال: حدثّنا الليث [بن سعد] عن [عبد الله بن عبيد الله] بن أبى مُلَيكه، عن المِسوَر بن مَخرَمه, قال: سمعتُ رسول الله | وهو على المنبر يقول: «ان بنى هشام بن المغيره استأذنونى فى أن يُنكِحوا ابنتَهم علىّ× بن أبى طالب, فلا آذنُ ثمّ لا ـ آذنُ, إلّا أن يريد ابن أبى طالب أن يُطلِّق ابنتى ويَنكح ابنتَهم، فانما هى بضعه منّى, يريبنى ما رابها, ويؤذينى ما آذاها».

Məxrəmənin oğlu Misvər deyir: Rəsulullahın (s) minbərdə belə buyurduğunu - ١٣٣ eşitdim: "Hişam ibn Müğəyrənin övladları tayfalarından bir qızı Əli ilə evləndirmək üçün icazə istəyirlər. Mən icazə vermirəm. Əbu Talibin oğlunun qızımı boşayıb, onlardan bir qızı almasına icazə vermərəm. Fatimə mənim vücudumun parasıdır. Onu narahat .(edən məni narahat edib və ona əziyyət edən mənə əziyyət etmişdir*"(٢



---

Yüz otuz ikinci hədis başqa mənbələrdə: "Müsnədi Təyalisi", s١٩۶, hədis ١٣٧٣; . [١] -١ "Fəzaili Əhməd", s٧۶۴, hədis ١٣۴۵; "Səhih Buxari", c٨, s٧٩, (kitabul-istizan, bab ۴٣), hədis ١; "Səhih Müslim", c۴, s١٩٠۴, (bab ١۵), hədis ٢۴۵٠; "Ahad və Məsani", c۵, s٣۵٨, hədis ٢٩۴۶, və s٣۶٧, hədis ٢٩۶٧; "Əz-zür-riy-yətüt-tahirə", s١۴٢, hədis ١٧٩; "Müşkilul-asar", c١, s٣۵, hədis ٩۵-٩۶; "Möcəmi kəbir Təbərani", c٢٢, s۴١۵, hədis ١٠٢۴, və s۴١٩, hədis ١٠٣٣; "Fəzaili Fatimə İbn Şahin", s۵۶, hədis ۶, və s۵٩, hədis ٨; "Hilyətul-əvliya", c٢, s٣٩; "Dəlaili .Bihəqi", c٧, s١۶۴-١۶٧

Yüz otuz üçüncü hədis başqa mənbələrdə: "Səhih Buxari", c٧, s۴٧, (kitabun- . [٢] -٢

nikah), bab ١٠٩; "Səhih Müslim", c٤, s١٩٠٢, hədis ٢٤٤٩; "Sünəni Əbu Davud", c٢, s٢٢۶, hədis ٢٠٧١; "Sünəni Termizi", c٥, s۶٩٨, hədis ٣٨۶٧; "Şərhüs-sünnə Bəğəvi", c١٤, s١٥٩, hədis ٣٩٥٨. *. Yüz otuz üç və yüz otuz dördüncü hədis Əməvilərin Peyğəmbərin (s) ailəsinə kin- küdurətləri olduğu üçün düzəltdikləri bir əfsanədir. Rəsulullahın (s) Fatimənin fəzilətləri barəsində "Fatimə mənim bədənimin parasıdır Fatiməyə əziyyət edən mənə əziyyət etmiş, Fatimənin qəzəbi mənim qəzəbim, mənim qəzəbim isə Allahın qəzəbidir" kimi buyurduğu qəti hədisləri inkar edə bilmiyənlər və habelə O Həzrətin (s) vəfatından sonra başqalarının etdiyi zülm və əziyyətləri gizlədə bilmiyənlər həqiqətlərin üstünə pərdə çəkmək üçün Əlinin (ə) Bəni Hişamın qızına elçilik etməsi hədisini düzəltmişlər. Bu hədisin yalan və saxta olmasına neçə nişanə vardır: ١) Bütün tarixçilərin nəzərinə əsasən bu iki hədisin rəvayətçisi olan Misvər ibn Məxrəmə Rəsulullahın (s) hicrətindən sonra dünyaya gəlmişdir. O elçilik hadisəsi baş verən zaman altı ya yeddi yaşında idi. Bununla belə o bu hədisi (١٣٧-ci hədisi) eşitdiyi zaman özünün həddi-büluğ olduğunu bildirir. ٢) Misvər Bəni-üməyyəyə məxsusən də Müaviyəyə xüsusi məhəbbəti var idi. Ürvə ibn Zübeyr deyir: O, Müaviyənin adını eşidən zaman ona salam göndərirdi. ٣) Əlinin (ə) belə bir elçilik etdiyini fərz etsək də bu iş şəriətdə qadağan olunmuş bir iş deyil ki, təqva və Allahın əmrinə itaət etməyin nəticəsində dünya qadınlarının rəhbərliyi məqamına yetişmiş Həzrət Zəhra (s) və həmçinin Allahın əmrinə təslim olanların rəhbəri olan Rəsulullah (s) narahat olub bunu pis bir iş saysın. Rəsulullahın (s) ürəyində bu işdən narazı olduğunu fərz etsək də onu dilinə gətirdikdən sonra minbərə çıxıb camaata elan etməsini qəbul etmək olarmı? Belə bir rəftarın Rəsulullahın (s) məqam, rütbə və əxlaqı ilə uyğunluğu varmı? Buna görə bu saxta hədislər Əliyə (ə) tənə olmadan öncə Rəsulullaha (s) tənədir.Nəticədə bu hədislərin arasından Əhli-beytin vasitəsi ilə də rəvayət olunan hədislər qəbul olunasıdır. Onlarda Rəsulullah (s) buyurur: "Fatimə mənim bədənimin parasıdır. Fatiməyə əziyyət edən mənə əziyyət etmişdir. Fatimənin qəzəbi Allahın qəzəbidir". Lakin Peyğəmbərin (s) ailəsinin düşmənləri başqa səhabələrin əksinə olaraq Əlinin (ə) Rəsulullaha (s) qarşı rəftarında kiçik bir itaətsizlik belə müşahidə etmədikləri üçün bu hədislərin bəzisini saxtalaşdırmağa çalışdılar.Və həqiqətin gizlin qalmayacağından qəflət edərək Əlinin (ə) elçilik etməsini bu hədislərə əlavə etdilər. (Daha çox izah üçün

.(Məhəmməd Kazim Əl-Məhmudinin "Xəsaisi Nisaiyə" verdiyi izahata bax. s١٨٨-١٩١

۱۳۴. أخبرنا أحمد بن سليمان، قال: حدثّنا يحيى بن آدم، قال: حدثّنا بشر بن السرى، قال: حدثّنا ليث بن سعد، قال: سمعت ابن أبى مُلَيكه يقول: سمعت المِسور بن مَخرمه, يقول: سمعتُ رسول الله| بمكّه يخطب, ثمّ قال: «ان بنى هشام استأذنونى فى أن يُنكِحوا ابنتَهم علىّ×اً وانى لاـ آذنُ ثمّ لاـ آذنُ, إلّا أن يريد ابن أبى طالب أن يُفارِق ابنتى, وان يَنكَح ابنتَهم». ثمّ قال: أن فاطمه مضغه ــ أو: بضعه ــ منّى, يؤذينى ما آذاها, ويريبنى ما رابها، وما كان له أن يجمع بين بنت عدوّ الله وبين ابنه رسول الله».

Bu hədis də qabaqkı hədis kimidir. Nisai onu başqa -۱۳۴

səh:۹۸

